# Ali məktəb tələbələrində kreativliyin inkişaf etdirilməsi üçün təlim metodları

**Nigar Zeynalova**

**Müəllif:**
Nigar Zeynalova — Pedaqogika üzrə fəlsəfə doktoru, Azərbaycan Dillər Universiteti pedaqogika kafedrasının dosenti. E-mail: nigarzeynalova777@gmail.com

**Açar sözlər:**
Ali məktəblər, təlim metodları, kreativ inkişaf, tələbə kontingenti, təhsil proqramları, sillabus, təlim proseslərinə yardıcı yanaşma.

**Annotasiya.** Məqalədə ali təhsil müəssisələrində tələbələrin kreativliyinin formalaşdırılması yolları nəzərdən keçirilir. Bu istiqamətdə fənlərin yaranma tarixi araşdırılır. Kreativ təhsil vermə təcrübəsinə malik ali təhsil müəssisələrində yaradıcılığın inkişafına zəmin yaradan təhsil proqramları haqqında məlumat verilir. Ali məktəb tələbələrində kreativliyin formalaşdırılmasına təsir göstərən amillər sadalanır. Bir çox nüfuzlu universitetlərin hazırda alternativ təlim mühiti olan virtual texnologiyalardan istifadə təcrübəsi şərh edilir, təlimin virtual təşkilinin üstünlükləri haqqında məlumat verilir. Təlim prosesinin informasiya texnologiyalarına əsaslanmaqla təşkilinin tələbələrdə tənqidi və kreativ təfəkkürün inkişafına təsiri, onları gələcək peşə fəaliyyətinə istiqamətləndirməsi, kreativliyi stimullaşdırması məsələləri öyrənilir. Maraqlananlar üçün kreativliyin inkişafını təmin edən proqramların hazırlanmasında məzmuna deyil, daha çox prosesə əhəmiyyət verilməsi, *fasilitasiya* qaydalarına əsaslanma, kollaborativ tələbəyönümlü öyrətmə metodlarından istifadənin və öyrənmənin dəstəklənməsinin əhəmiyyəti qeyd olunur.

**DOI:**
**Məqaləyə istinad:**
Nigar Zeynalova. Ali məktəb tələbələrində kreativliyin inkişaf etdirilməsi üçün təlim metodları. *«Azərbaycan məktəbi» jurnalı.* № 2, 2018. səh. 41–50

**Məqalə tarixçəsi**
Göndərilib: 16.05.2018; Qəbul edilib: 06.06.2018; Nəşr edilib:

# The training methods for the development of the creativity of High School students

**Nigar Zeynalova**

**Author:**
Nigar Zeynalova,
Azerbaijan University of Languages, Department of Pedagogy, PhD. Docent.
Azerbaijan, Baku. E-mail: nigarzeynalova777@gmail.com

**Keywords:**
High schools, training methods, creative development, student quota, educational programs, sillabus, auxiliary approach to training processes.

**Abstract.** The article examines the ways of forming the creativity of students in higher educational institutions. The history of the formation of objects related to it is studied. Information is provided on educational programs that establish the grounds for creativity in higher education institutions with experience in providing creative education.

Mention is made of factors that affect the formation of creativity of high school students. Describes the experience of using virtual technologies that have alternative learning conditions in the most prestigious universities at the present time; gives information about the advantages of a virtual device. The main attention is paid to the influence of the learning process on the basis of information technologies on the development of criticism of students and creative thinking, their direction to future professional activities and issues of stimulating creativity. In the development of programs that ensure the development of students' creativity, the importance is attributed not to content, but to the process, based on the rules of facilitation that support co-education and training of students.

**DOI:**
**To cite this article:**
Nigar Zeynalova. The training methods for the development of the creativity of High School students. *Azerbaijan Journal of Educational Studies.* No2, 2018. pp. 41–50

**Article history**
Received: 16.05.2018; Accepted: 06.06.2018; Published:

## Giriş

Müasir dövrdə innovasiya və kreativliyin sürətli inkişafı təkcə texnologiya və mədəniyyət sahələrində deyil, gündəlik fəaliyyətdə də tələb olunur. Bu isə təhsil sisteminin qarşısında yeni məqsəd və vəzifələr qoyur. «Təhsil haqqında» Azərbaycan Respublikasının Qanununda qeyd olunmuşdur ki, təhsilin əsas məqsədi «geniş dünyagörüşünə malik olan, təşəbbüsləri və yenilikləri qiymətləndirməyi bacaran, nəzəri və praktik biliklərə yiyələnən, müasir təfəkkürlü və rəqabət qabiliyyətli mütəxəssis-kadrlar hazırlamaqdır» [«Təhsil haqqında» Azərbaycan Respublikasının Qanunu, 2009]. Maddədən irəli gələn tələblərin reallaşdırılması bir neçə istiqamətdə fəaliyyətlərin təhlilini və təşkilini nəzərdə tutur. Onlardan ən önəmlisi pedaqoji kadr hazırlığı ilə məşğul olan ali təhsil müəssisələrinin keyfiyyət göstəricilərinin müəyyənləşdirilməsi və həmin məlumatlara əsasən pedaqoji fəaliyyətin tənzimlənməsidir.

Bu sahədə atılan ilk addım, Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında qeyd olunduğu kimi, təhsilin məzmununun yenidən qurulması, «ölkənin sosial-iqtisadi inkişaf tələbləri və prioritetləri» nəzərə alınmaqla müasir dövrün tələblərinə cavab verən kurikulumların-proqramların işlənilməsidir. İnnovativ kurikulumların hazırlanmasında əmək bazarının mövcud və perspektiv tələbləri, elmi-texniki tərəqqi, innovasiyalar əsas götürülməli, nəzəri biliklərlə yanaşı, praktik bacarıqların, habelə müxtəlif kompetensiyaların mənimsədilməsi məsələləri diqqət mərkəzində olmalıdır.

## Problemin aktuallığı

Tədqiqatımıza problemlə bağlı xarici təcrübənin araşdırılması ilə başlayaq. 2010-cu ildə ABŞ-da kollec və universitet assosiasiyasının əmək bazarında işə götürənlər arasında keçirdiyi sorğu şirkətlərin, fabriklərin, ümumiyyətlə, bütün işəgötürənlərin məzunlardan olan gözləntilərinin dəyişdiyini müəyyən etmişdir. Respondentlərin 90 %-i qeyd etmişdir ki, keçmişdən fərqli olaraq, müasir mütəxəssis əmək bazarının yüksək və mürəkkəb tələbatlarını ödəmək üçün daha yüksək səviyyədə bilik və bacarıqlara malik olmalıdır. Respondentlərin yalnız 28 %-i məzunların əmək fəaliyyətindən razı qaldıqlarını demiş, 68 %-i isə bu istiqamətdə fəaliyyətin təkmilləşdirilməsinin zəruriliyini xüsusi vurğulamışdır. Ali təhsilin nəticələrinin dövrün tələblərinə cavab verməməsi işəgötürənlərin seçiminə, onların işgüzar münasibətlərinə, məzunların işlə təminatına və ixtisasa uyğun əmək bacarıqlarının formalaşmasına təsirsiz ötüşmür.

Sadalanan məqamlar müxtəlif sahələrdə dünyaya geniş inteqrasiya edən Azərbaycan təhsilinə də aiddir. Artıq təhsildə öyrənənlərin ümumi kreativlik bacarıqlarının inkişafını təmin edən modelin hazırlanması zərurəti aktuallaşmışdır. Həmin bacarıqlara ideyalar ortaya atmaq, kreativ komandada fəaliyyət göstərmək, imkanları dəyərləndirmək, vəziyyəti müəyyənləşdirmək, təhlillər aparmaq, problem ətrafında insan və resursları səfərbər etmək və s. aiddir. Bunlar kreativ düşüncəyə malik tələbələrdə daha tez və keyfiyyətli şəkildə formalaşır. Lakin ali məktəb tələbələrində kreativliyin inkişafı hələ də günün problemi olaraq qalır.

Bu gün ali məktəblərin problem əsaslı təlim metodlarına üstünlük verməsi tələbələrə özəl şirkətlərdə, hökumət və qeyri-hökumət təşkilatlarında qarşılaşa biləcəkləri real vəziyyət və problemlər üzərində çalışmağa, onların həlli istiqamətində təkliflər hazırlamağa münbit şərait yaradır. Tələbələr mürəkkəb, daim dəyişən, qeyri-müəyyənliklərlə dolu iş dünyasında bilik, bacarıq və praktiki vərdişlərlə yanaşı, araşdırmaq, təhlil etmək bacarıqlarına, irəliləmək istəyinə, təxəyyül və təcrübi kreativliyə malik olmalıdırlar. Bu məqamlar nəzərə alınaraq təlim prosesinin təşkil edilməsi cəmiyyətin inkişafına əvəzsiz töhfələr verə bilər. Tədqiqatçılar universitetlərin şirkət və müəssisələrlə əlaqəsini, əməkdaşlığını yüksək dəyərləndirir, tələbələrin internship proqramlarında iştirakının zəruriliyini vurğulayırlar.

Onlar bildirirlər ki, təhsil ocağının akademik heyəti bu əlaqələri daha da möhkəmləndirməyə çalışır [Vega-Jurado J., Fernández-de-Lucio I., Huanca R. 205-220, 2008]. Digər tədqiqatçılar tələbələrin sahibkarlarla, şirkətlərlə əməkdaşlığının hər iki tərəfin fəaliyyətində yüksək dinamikaya təkan verdiyini sübuta yetirmişlər.

Kreativliyin inkişafına təsir göstərən digər amil qismində yüksək təlim texnologiyalarının tətbiqini xüsusi vurğulamaq lazımdır. ABŞ-ın bir çox nüfuzlu universitetləri hazırda alternativ təlim mühiti olan virtual texnologiyalardan istifadəyə (cloud computing, cloud technology) üstünlük verirlər. Kanadanın öncül ali təhsil müəssisələri, Asiya və Avropanın qabaqcıl universitetləri də son 10 il ərzində təlimin virtual təşkilini həyata keçirir. *Cloud* texnologiyası tələbələr arasında əlaqələrin möhkəmlənməsində və təlimin keyfiyyətinin yüksəlməsində müstəsna rola malikdir. Təlim prosesinin informasiya texnologiyalarına əsaslanmaqla təşkili tələbələrdə tənqidi və kreativ təfəkkürü inkişaf etdirir, kreativliyi stimullaşdırır, onları gələcək peşə fəaliyyətinə hazırlayır. Bu məsələ istənilən elm sahəsində aktuallıq kəsb edir və yeni təhsil paradiqminin yaradılmasını labüdləşdirir. Məhz həmin təlim modeli insanın yaradıcı potensialını üzə çıxarıb inkişaf etdirə bilər. Təhsilin bu növünün psixoloji-pedaqoji biliklər əsasında qurulması vacibdir. Müasir dövrdə dünyanın bir çox aparıcı universitetləri təhsil proqramları və təlim planlarında müvafiq dəyişikliklər apararaq həm müxtəlif fənlərin tədrisində, həm də yeni fənn və ixtisasların hazırlanmasında kreativliyi nəzərə almışlar. Hələ 1975-ci ildə ABŞ-ın Nyu-York ştatındakı Baffalo kolleci ilk dəfə olaraq kreativlik üzrə magistr proqramı təklif etmişdir. Daha sonra magistraturada «Kreativliyin öyrənilməsi», bakalavriatda isə «Kreativ liderlik» adlı proqramlar irəli sürülmüşdür. Proqramlar potensial mütəxəssisləri peşə fəaliyyətində lazımi bilik və bacarıqlarla təmin etmək məqsədi daşıyırdı [Wyke R. pp. 11-19, 2013]. Onların müsbət təcrübəsinə əsasən hazırda dünyanın aparıcı universitetlərinin magistratura səviyyəsində «Kreativlik və innovasiyalar: yeni müəssisələrin yaradılması», «Kreativliyin idarə olunması», «Sahibkarlıq kreativliyi», «Biznesdə kreativlik», «Dizayn, innovasiya və kreativliyin idarə olunması», «Kreativliyin nəzəriyyəsi və tətbiqi», «Dəyişikliklər və kreativlik» adlı fənlər tədris olunur. Hazırda psixologiya və təhsil sahəsində də «Kreativliyin nəzəriyyəsi», «Problemlərin kreativ həlli», «Kreativliyin elmi araşdırılması», «Kreativliyin psixologiyası», «Kreativlik və etika: bunları ayırmağa dəyərmi?», «Əqli qabiliyyətlər, kreativlik və istedad», «Kreativliyin və təxəyyülün inkişafı» kimi kurslar təşkil edilir [Wyke R. pp. 11-19, 2013].

Bu gün *kreativliyin tədrisi coğrafiyası* olduqca genişdir. Cənubi Koreya, Yaponiya, Çin universitetlərində də kreativlik probleminin araşdırılmasına xüsusi diqqət yetirilir. Qeyd olunan ölkələrin alimləri kreativliyin inkişafına təsir göstərən bilik, bacarıq və mühit amillərini öyrənir və onların təsir dairəsini müəyyənləşdirirlər [Torrance E. 260 p.1964; Wyke R. pp. 11-19, 2013].

London Siti Universiteti «İnnovasiya, kreativlik və liderlik», Malta universitetləri «Lateral düşüncə»nin müəllifi Edvard de Bononun (2012) əməkdaşlığı ilə hazırlanmış «Kreativlik və innovasiyalar» ixtisası üzrə təhsil təklif edir. ABŞ-ın Saybruk Universiteti psixologiya və humanitar elmlər üzrə magistr və fəlsəfə doktoru dərəcəsi verməklə «Kreativlik» ixtisası almaq imkanı yaradır. Təhsilalanlara kreativliyin yaranması, inkişafı, gündəlik həyat fəaliyyətində onun tətbiqi imkanları haqqında geniş məlumat təqdim edilir. Proqram müxtəlif sahələrdə tətbiq olunmaq məqsədilə işlənib hazırlanmışdır.

Bununla yanaşı, əksər universitetlərdə Kreativlik və İnnovasiya mərkəzləri fəaliyyət göstərir. Qeyd etmək lazımdır ki, Azərbaycanda da son illər innovasiya mərkəzləri yaradılır və fəaliyyət göstərir, lakin onların fəaliyyət məzmununda kreativlik nəzərə alınmamışdır. Respublikamızın ali təhsil müstəvisində kreativliyin inkişafı istiqamətində müvafiq işlər aparılsa da, hələ dünya miqyasına çıxarılan

tədqiqatların sayı qənaətbəxş deyil, universitetlərimiz kreativliklə əlaqədar fənlər təklif etmir, proqramlar hazırlamırlar.

Fransız filosofu Henri Berqson yazır: «Mən inanıram ki, istənilən vaxt, həyatımın hər bir məqamında kreativlik göstərməyi bacararam» [Prigogine I. 396–400, 1989]. Fikrə dəstək olaraq və aparılan tədqiqatlara əsasən deyə bilərik ki, kreativlik inkişaf etdirilə bilər. Lakin təlim prosesində bu istiqamətdə fəaliyyətin təşkilinə dair suallar hələ də müzakirə predmeti olaraq qalır. Əlbəttə, kreativliyin inkişafı bilavasitə təlim proqramları və sillabusların düzgün tərtibatından, hazırlanmasından asılıdır. Kreativlik sahəsində aparılan tədqiqatların ali məktəblərin təlim-tərbiyə prosesində tətbiqinə xüsusi diqqət yetirilməlidir. Təhsildə bu anlayışın yeni olduğunu nəzərə alsaq, onun haqqında kifayət qədər məlumatın olmaması təəccüblü deyil. Əksəriyyət kreativliyin inkar edilməsini mistik mücərrəd anlayış (Platon nəzəriyyəsinin tərəfdarları) olması, bəziləri isə XX əsrin əvvəllərində *biheviorizm, funksionalizm* və s. məktəblərin nümayəndələrinin onu danması ilə əsaslandırır. Praqmatistlər kreativliklə bağlı fikir və ideyalar söyləsələr də, təlim prosesində onun əhəmiyyətini dəstəkləsələr də, heç bir elmi sübut gətirməmiş, fikirlərinin akademik şərhini verə bilməmişlər.

Biz tədqiqatımızı belə bir ideya üzərində qururuq ki, kreativliyin inkişafına yönələn təhsildə şəxsiyyətin fərdi potensialının tanınması və qəbul edilməsi əsas prinsip kimi götürülməli, pedaqoji proses onun üzərində qurulmalıdır. Məktəbəqədər təhsil pilləsindən başlayaraq, təhsilin əsas vəzifəsi öyrənənlərin təfəkkürünün inkişaf etdirilməsi, tədqiqat bacarıqlarının formalaşdırılması və dəstəklənməsindən ibarətdir. Təlim prosesinin belə təşkili təhsilalanları birgə fəaliyyətə, problem həllinə və qərar qəbuluna alışdıracaq, onlara əldə olunan nəticələrin əhəmiyyətini dəyərləndirməyi öyrədəcəkdir.

Hətta ən kreativ müəllim avtoritar təlimlə, innovasiya və açıq düşüncə tərzini inkar edən sistem çərçivəsində uğur qazana bilməz. Təfəkkürün çevikliyi sosial sistemin çevikliyindən asılıdır. Belə sistem nəinki yaşamaq üçün zəruri bacarıq və qabiliyyətlərin inkişafına şərait yaradır, həmçinin cəmiyyətin inkişafını labüdləşdirir. Deməli, kreativlik fərdə xas olan və ya olmayan xüsusiyyət, seçilmişlərin üstünlüyü kimi qəbul oluna bilməz. O, dövrün tələbi kimi təhsil sisteminə çağırışdır. Kreativliyin dəyəri təkcə ayrı-ayrı fərdlər üçün deyil, bütün cəmiyyət üçün yüksək və danılmazdır. Bir tərəfdən o, tarixi təkamül amili, digər tərəfdən isə fərdi potensial qismində çıxış edir. Bu potensial insana həyatını, gələcəyini, mühiti dəyişməyə imkan yaradır, müxtəlif situasiyalarda fəaliyyət göstərməyi, qarşılaşdığı problemləri çözməyi stimullaşdırır. Hazırda hər kəs sözdə kreativliyi yüksək dəyərləndirsə də, reallıqda həyatın müxtəlif sahələrində, xüsusilə də təhsildə ona lazımi dəyər vermir. Təhsildə kreativliyi diqqət mərkəzində saxlamaq vacibdir, çünki məhz bu sahə gənclərin, övladlarımızın gələcəkdə müstəqil əmək fəaliyyətində uğur qazanmasına görə məsuliyyət daşıyır. Təlim proqramlarının giriş hissəsində, izahat vərəqində, sillabusların müvafiq bölmələrində «kreativlik» anlayışına rast gəlsək də, metodik vəsaitlərdə kreativlik ideyasının reallaşdırılmasına dair konkret nümunələr yox səviyyəsindədir. Həmçinin, müəllimin praktik fəaliyyətində və real təlim vəziyyətlərində də kreativlik ideyasının reallaşdırılması öz əksini tapmır.

## Fənn proqramları və sillabuslar

Universitet tələbələrində kreativliyin inkişafının təmin olunması fənn proqramları və sillabuslardan başlanmalıdır. Proqramların tərtibində ədəbiyyat siyahısı və onun əsasında fəaliyyətin təşkili kreativliyin inkişafını təmin edən amillərdir. Ali məktəb tələbələrində kreativliyi inkişaf etdirmək, onları kreativ olmağa həvəsləndirmək üçün təlim proqramlarını nəzərdən keçirmək mütləqdir, çünki onların kreativliyin inkişafına təsiri bilavasitədir. «Biz, adətən, tələbələrin daxili motivasiyasına lazımi diqqət yetirmirik, lakin

məhz o, kreativliyin üzə çıxmasında və formalaşmasında aparıcı rol oynayır. Bu məqsədlə daxili motivasiyanı və öyrənənlərin istedadlarını dəstəkləyən işgüzar mühitin yaradılması mühüm əhəmiyyət kəsb edir. Prosesin tənzimlənməsi təhsilalanlara lazımi səviyyədə müstəqilliyin verilməsi ilə müşayiət olunmalıdır» [Amabile T.M. 2006]. Həmin fikrə əsasən qeyd etmək istərdik ki, təlim proqramları müvafiq tələblər əsasında hazırlanır. Bəzən bu tələblər təhsilalanların özünüifadə imkanlarını, müstəqilliyini məhdudlaşdırır. Bu isə kreativliyin inkişafına, təlim məqsədinə çatmağa maneələr törədir. Tələbələrdə kreativliyin inkişafını qarşımıza məqsəd qoymuşuqsa, ənənəvi təhsildən fərqli, daha geniş düşüncə tərzi nümayiş etdirmək məcburiyyətindəyik. Qarşıya qoyulmuş məqsədə çatmaq öyrənənlərdə kreativliyi formalaşdırmağa zəmin olan, xüsusi formada hazırlanmış təlim proqramları vasitəsilə mümkündür. Belə proqramlar təhsilalanların daxili motivasiyasının yüksəlməsini, təlim müstəqilliyindən lazımınca yararlanmağı təmin edir.

Biliklərin yaradıcı bacarıqlara çevrilməsi müasir təhsilin mahiyyətini təşkil edir. Bu səbəbdən kreativ təlim proqramlarının hazırlanması və tətbiqi zamanın tələbinə çevrilmişdir. Yaradıcılığa istiqamətləndirən təlim proqramları tələbələrdə kreativ prosesləri stimullaşdırır. Təhsilalanlarda kreativ düşüncə tərzini müxtəlif ölkələrdə müxtəlif fənlərdə inkişaf etdirmək məqsədilə dünyanın aparıcı tədris müəssisələrində bir sıra fənlər təlim proqramlarına daxil edilmişdir. Onların məzmunu analogiyaların aparılmasına, ideyaların bir kontekstdən, vəziyyətdən digərinə kreativ və lateral şəkildə köçürülməsinə, müxtəlif fənlərdən biliklərin inteqrasiyasına, qeyri-adi ideyaların generasiyasına, ümumi mənzərənin əvvəlcədən müəyyənləşdirilməsinə, fərqli düşüncə tərzlərinin analizinə zəmin yaradır.

Ali məktəb tələbələrində kreativliyin formalaşdırılması iki əsas amildən asılıdır:

1. *Təlim prosesini planlaşdırmaq.* Bu amil kreativliyi inkişaf etdirmək üçün təhsil müəssisəsinin və müəllimin üzərinə müəyyən öhdəliklər qoyur. Həmin vəzifələrin yerinə yetirilməsi məsələnin həllinə böyük töhfə verir.

2. *Tələbələri həvəsləndirmək, onlara seçim imkanı vermək, gözlənilməz vəziyyətlərdə işləmək imkanı yaratmaq.* Bu amil kreativlik potensialının kəşfi, üzə çıxarılması üçün zəmin rolunu oynayır.

Deyilənlərdən belə qənaətə gəlmək olar ki, təlim proqramları gözlənilən deyil, daha çox gözlənilməz vəziyyətlər, problemlər nəzərə alınaraq hazırlanmalıdır. Artıq nəticəyönümlü proqramlar müasir dövr üçün aktuallığını itirir. Çünki onlar fövqəladə hallarda fəaliyyət göstərə bilən mütəxəssis hazırlığını təmin edə bilmir. Deməli, daha çevik və yaradıcı təlim proqramlarının hazırlanması labüddür. Onların tərtibi zamanı gözlənilməz situasiyalarda qərar qəbulu, problem həlli kimi bacarıqların formalaşdırılması məsələsi diqqət mərkəzində saxlanılmalıdır.

Tələbələrdə kreativlik müxtəlif istiqamət və fərqli səviyyələrdə özünü göstərdiyi üçün peşəkar müəllim akademik proqramdan kənara çıxa bilər. Paul Roberts bildirmişdir ki, öyrənənlərin dərsdən sonrakı məşğuliyyətləri də müəllimin fəaliyyətini qurmasına təsir göstərir. Təhsil müəssisələri şagirdlərin dərsdən sonrakı fəaliyyətləri ilə maraqlanmırlar. Bu fikri ali məktəblərə də şamil etmək olar [Roberts P. 2006]. Universitet proqramları auditoriyaların hüdudlarını aşaraq tələbələri real həyata hazırlamalıdır. Ali təhsil müəssisələri məsələni diqqətdə saxlamaq üçün praktik, həyatla birbaşa əlaqəli tədris proqramının tərtib edilməsini qarşısına məqsəd qoymalıdır.

Təlim proqramlarının həyatla əlaqəliliyi kreativliyin inkişafını üç istiqamətdə dəstəkləyir:

1. Tədris olunan fənn və onunla əlaqəli digər fənlərdə innovativliyi və müvəffəqiyyəti təmin edir. Prosesin tənzimlənməsində yalnız incəsənət fənləri deyil, başqaları da böyük rol oynayır.

2. Gələcək peşə fəaliyyətində innovativliyi və müvəffəqiyyəti təmin edir. Buraya təkcə kreativliyi özündə ehtiva edən incəsənət sahələri deyil, eləcə də digərləri aiddir.

3. Təhsil alanların universitet mühitindən kənarda özünüifadəsi. Bu istiqamət yaradıcı şərait və imkanlarla xüsusilə zəngin olduğundan, reallaşdırılması daha mürəkkəbdir.

Hər bir istiqamət sosial təcrübənin qazanılması üçün müxtəlif forma və kontekstləri özündə cəmləşdirir, kreativ fəaliyyətin qiymətləndirilməsini təmin edir və proses haqqında fikir bildirməyə həvəsləndirir.

Akademik proqramlar, adətən, fənnin öyrənilməsinə, təcrübədən keçirilmiş və hər kəs tərəfindən qəbul edilmiş biliklərin ötürülməsinə köklənir, daha çox nəzəriyyə yüklü olur, müəllimin təlimat xarakterli fəaliyyətini, tələbələrin məlumatı fərdi şəkildə öyrənməsini nəzərdə tutur.

Akademik proqramlardan fərqli olaraq, praktikyönümlü proqramlar təhsilalanların biliklərinin təcrübədə tətbiqini, müstəqil fəaliyyətini, tədqiqat aparmaq bacarıqlarını dəstəkləyir. Bu tip proqramlar iki istiqaməti əhatə edir:

1. Biliklərin akademik sahədə tətbiqi.
2. Biliklərin real həyatda tətbiqi.

Belə təlim proqramları tələbələri auditoriyanın hüdudlarından kənarda da real əmək fəaliyyətinə, peşə vərdişlərinə, təcrübə mühitinə yaxınlaşdırır, onları həyati bilik və bacarıqlarla təmin edir. Sahə üzrə ekspertlərin biliklərinin real şəraitdə, təcrübədə tətbiqi prosesini müşahidə etmək kreativliyin nə olduğunu əyani şəkildə mənimsəməyin ən optimal yoludur. Peşəkar müəllimin belə prosesdə rolu tələbələri təcrübəyə hazırlamaq, uğurla sınaqdan keçirilmiş strategiyalarla təmin etmək, onları istiqamətləndirmək, özünüqiymətləndirmə prosesini dəstəkləməkdən ibarətdir.

Praktik proqramlar tələbələrə öyrənmək imkanı yaradır, onları sosiallaşdırır, konkret peşə fəaliyyətinə hazırlayır.

Həyatla əlaqəli proqramlar öyrənənlərin həm təsadüfi, qeyri-formal, həm də formal (müəllim tərəfindən müəyyənləşdirilmiş) təliminin təşkilini, peşə mühitinə məxsus fiziki, emosional və sosial aspektləri özündə birləşdirir, dərs təhsilalanların maraq, meyil, tələbatına və seçiminə uyğun təlim mühitində keçirilir. Həyatla əlaqəli proqramlar akademik və praktik proqramlardan daha səmərəli hesab olunur, çünki onlar təhsilalanları kreativliyin inkişafına həvəsləndirir, yaradıcılığı üzə çıxarır, dəstəkləyir, dəyərləndirir, özünüqiymətləndirməni təmin edir. Təhsilalanların həyatının hər bir tərəfi onlar üçün maraqlı və əhəmiyyət kəsb edən məsələlər üzrə kreativlik və özünüifadəyə əvəzolunmaz imkan yaradır. Tələbələrin həyatının müxtəlif aspektləri ilə maraqlanmaq təlimdə daxili motivasiya və onun inkişafı mexanizmlərinə əsaslanaraq, kreativliyin inkişafını mümkünləşdirir. Lakin bu da hazırda ali təhsildə yüksək dəyərləndirilən nəticəyönlü proqramda yer almamışdır. Təhsil müəssisəsi kreativliyin və yaradıcılığın tətbiqinə maraq göstərdikdə bu istiqamətdə lazımi addımlar atacaq, müvafiq üsullar, vasitələr, strategiyalar işləyib hazırlayacaq.

İstənilən proqramın hazırlanması və təkmilləşdirilməsi zamanı tələbələrdə kreativliyin tərbiyə olunması və inkişafının təmin edilməsi, kreativ düşüncə tərzinin formalaşdırılması məsələsinə xüsusi diqqət ayırmaq mümkündür [Knight P. 2002]. Knight tələbələrdə kreativliyin inkişafını təmin edən prinsiplər işləyib hazırlamışdır. Onları işində rəhbər tutan müəllimlər tələbələri kreativliyə həvəsləndirmə istiqamətində öz imkanlarından düzgün istifadə edəcək və kreativliyin inkişafını təmin edən proqramın hazırlanmasına nail olacaqlar.

Tədqiqatçının müəyyən etdiyi prinsiplər:

1. *Müəllimin öyrətmə və öyrənmə konsepsiyası.* İnsanın istənilən fəaliyyəti təxəyyülü əsasında həyata keçirilir və ya dayandırılır. Təhsilalanlarda kreativliyin inkişafını dəstəkləyən ideya və konsepsiyalara görə müəllim tələbələri problemli təlim prosesinə cəlb etməli, onlara prosesləri idarə etməyə, problemi həll etməyə şərait yaratmalıdır. Öyrədənin

faydalandığı təlim strategiyaları tələbələrdə daxili motivasiyanın yüksəlməsini təmin etməli, onların aşağı qiymət almaq qorxusunu çətin problemlərin həllinə yönələn stimula çevirməlidir. Müəllim təlim prosesinin optimallaşdırılması məqsədilə mütəmadi refleksiyanın keçirilməsini də diqqət mərkəzində saxlamalıdır. Prosesin düzgün tənzimlənməsi öyrədənin təcrübəsini artırmağa, peşə fəaliyyətini təkmilləşdirməyə zəmin yaradır.

2. *İdeya, konsepsiya və təcrübə mübadiləsi.* Təlim prosesində kreativliyin inkişafını təmin edən proqramların hazırlanması məqsədilə müəllimlər fikir mübadiləsi, müzakirələr aparmalıdırlar. Diskussiyalar «Kreativlik nədir və hansı üsullarla inkişaf etdirilməlidir?» kimi suallara aydınlıq gətirəcək və müəllimə təlim strategiyasını müəyyənləşdirməkdə kömək göstərəcək.

3. *Müəllimlərin peşə fəaliyyətinin təkmilləşdirilməsi.* Tələbələrdə kreativliyi inkişaf etdirmək üçün öyrədən fasilitasiya, kollaborativ pedaqoji modellərdən yararlanmaq bacarıqlarına malik olmalıdır. Prosesin düzgün tənzimlənməsində müəllimlərin bilik, bacarıq və imkanlarının formalaşdırılması vacib amillər kimi diqqətdə saxlanılmalıdır. Sadalanan amillərin təkmilləşdirilməsi də tələbələrdə kreativliyin inkişafına böyük töhfə verə bilər.

4. *Mövcud proqramların təhlili.* Bu prinsip müasir proqramların məzmunundakı kreativlik elementlərinin müəyyənləşdirilməsinə, mövcud proqramlarda fənn daxilindəki kreativlik imkanlarının ortaya çıxarılmasına və növbəti addımların planlaşdırılmasına zəmin yaradır.

5. *Müstəqilliyin təmin olunması.* Kreativliyin inkişafı müəllimlərdən təhsilalanların məqsədlərinə, qəbul etdiyi qərarlara hörmətlə yanaşmağı, təlim motivasiyasına şərait yaratmağı, tələbələrdə müstəqillik və özünüidarəetmə bacarıqları formalaşdırmağı tələb edir. Yaxşı hazırlanmış proqram tələbələri kreativ öyrənməyə hazırlayır, onlara müxtəlif vasitələrdən ən optimalını seçməyi, tətbiqini, həyata keçirməyi mənimsədir, tələbələrə müstəqillikdən faydalanmaq imkanı verir.

6. *Seçim və müzakirələrə hazırlıq.* Müəllim vasitələri-konsepsiya, ideya, strategiya, məlumat mənbələrini tələbələrə çatdırmalı, onları problemli vəziyyətdən çıxış yolu tapmağa stimullaşdırmalıdır. Həmçinin fəaliyyəti diqqətlə planlaşdırmalı, üsul, vasitə seçimi zamanı öyrənənlərin psixoloji durumunu təhlil etməli və mənimsəmə imkanlarını nəzərə almalı, fasilitator rolunda çıxış etməyi bacarmalıdır.

7. *Yeni tapşırıqların, problemlərin həlli.* Dərs divergent düşüncə tərzi formalaşdıran, müxtəlif təlim problemlərinin həllinə istiqamətlənən tapşırıqlar vasitəsilə həyata keçirilir. Müəllimlər cavabların həqiqətə uyğunluğunu müəyyənləşdirir, sonra isə tələbələri problem həlli strategiyalarına görə qiymətləndirirlər. Divergent düşüncə tərzini dəstəkləyən kreativ düşüncə texnikaları maneələrin aradan qaldırılması məqsədilə istifadə oluna bilər.

8. *Tələbələri kreativ təlim prosesi haqqında məlumatlandırmaq.* Tələbələr proqramın mahiyyəti və məzmunu haqqında əvvəlcədən müəyyən təsəvvürə malik olduqda kreativ təlim prosesinə daha tez və həvəslə daxil olurlar. Kreativ düşüncə bacarıqlarının inkişafı tələbələrin gələcək iş həyatında qarşılaşa biləcəkləri problemli vəziyyətlərdə yeni, hərtərəfli və fərqli düşüncə tərzinin nümayiş etdirilməsində əhəmiyyətlidir.

9. *İnnovasiya və dəyişikliklərə meyillilik.* Təlim prosesinin başlanğıcından etibarən dəyişiklik üçün imkan yaradılmalıdır. Bu həm müəllimə, həm də tələbələrə gözlənilməz hadisələrə adekvat reaksiya verməkdə kömək göstərir.

10. *Qiymətləndirmə.* Tələbələr təlim prosesinin iştirakçısına çevrilir və yekunda öyrəndiklərini tətbiq edirlər. Qazanılan nəticə öyrənənlərin kreativliyini və özünüifadəsini nümayiş etdirməyə əvəzolunmaz imkan yaradır. Yüksək gözləntilərə və uğura köklənən strategiyalar təhsilalanlarda kreativliyin nümayişinin bir forması kimi özünü göstərir. Bəzi müəllimlər düşünürlər ki, tələbələr qiymət xatirinə oxuyur. Bu yanaşma tələbələrdə kreativliyin inkişafının qarşısını alır. Əksinə,

təlimin sonunda summativ xarakterli qiymətləndirmə yalnız yadda qalan məlumatın həcminin qiymətləndirilməsini təmin edir. Qiymətləndirmənin meyarlar əsasında aparılması tələbələrin motivasiyasını yüksəldir, təlimə maraqlarını artırır, qiymətləndirmə prosesini şəffaf, obyektiv edir, zəif və güclü tərəfləri üzə çıxarır, tələbələrdə kreativliyin inkişafına mühüm töhfə verir.

## Bilik və bacarıqların ötürülməsi

Bir kontekstə aid bilik, bacarıq və davranışların digərində tətbiqi kreativliyin mühüm xüsusiyyətidir [Gardner H. 1993]. Müxtəlif düşüncə tərzləri biliklərin ötürülməsi ilə yanaşı, onların generasiyasında da mühüm əhəmiyyət kəsb edir. Bu formada təşkil olunan təlim prosesi öyrənənlərin istər adi, istərsə də qeyri-adi, yeni vəziyyətlərlə üzləşdikləri zaman uğurlu nəticələr verir. Təhsilalanlar real həyatda müxtəlif problemlərlə rastlaşdıqları üçün onların ali məktəb proqramlarında simulyasiyası labüddür.

Kreativliyin inkişafına daha çox prosesyönlü strategiyalar imkan yaratdığı üçün təlim proqramlarının hazırlanmasında məhz onlara yer ayrılmalıdır. Deməli, təlim prosesinin təşkili əldə olunan son nəticədən daha üstündür. Müəllimin dərsi planlaşdırması, təhsilalanların tədrisə cəlb olunması və fəaliyyətlərinin tənzimlənməsi təlim prosesinin ən önəmli xüsusiyyətləridir. Öyrənənlərdə kreativliyin inkişafını təmin edən proqram sadalanan cəhətlər nəzərə alınaraq hazırlanmalıdır, həmçinin məzmuna deyil, daha çox prosesə əhəmiyyət verilməli, fasilitasiya qaydalarına əsaslanmalı, kollaborativ tələbəyönlü öyrətmə və öyrənməni dəstəkləməlidir. Belə halda müstəqil və məntiqi düşüncəyə malik özününizamlamanı bacaran tələbələr məlumat mənbəyi kimi çıxış edirlər. Bu, təhsilalanlara dərs zamanı çoxçeşidli öyrənmə imkanı yaradır. Lakin nəzərə alınmalıdır ki, prosesyönümlü təlimin təşkili öyrənənlərdən müvafiq hazırlıq tələb edir və yalnız tələbələrin dəstəklənməsi nəticəsində reallaşır. Bunun üçün təhsilalanlarda özününizamlama bacarığı və özünüdərketmə tərbiyə olunmalıdır [Zimmerman B.J. pp.221-234, 2000].

## Nəticə

Özününizamlama əsasında təşkil olunan təlim müstəqil prosesləri və onlarla əlaqədar fikirləri cəmləşdirir, öyrənənləri yeni təşəbbüslərə həvəsləndirir. Bu, aşağıdakı amillərlə əlaqəlidir:

- planlaşdırma, təşkilatçılıq, özünütəlimat, özünümonitorinq, özünüqiymətləndirmə kimi metakoqnitiv proseslər;
- təlim mühitinin seçimi, strukturlaşdırılması və yaradılmasına dair vərdişlərin formalaşdırılması;
- özününizamlama, daxili imkanların üzə çıxarılması, təlimə marağın yaradılması, stimullaşdırıcı tədbirlərin həyata keçirilməsi vasitəsilə öyrənənlərdə motivasiyanın yüksəldilməsi.

Tələbələrdə kreativliyin inkişafına istiqamətlənən, yeni və gözlənilməz, qeyri-adi vəziyyətlərdə təlim prosesinin təşkilini dəstəkləyən təlim proqramlarının müxtəlif formaları – problemyönümlü, tədqiqatyönümlü, təcrübəyönümlü, məzmunyönümlü, rollu oyun, kollaborativ təlim və simulyasiyalar mövcuddur [Ellington H. 2002. Ellington H. 2004, Kneale P. 2004].

Yekun olaraq bildirməliyik ki, yuxarıda sadalanan proqram növlərinin hər birinin müsbət cəhətlərindən bəhrələnərək, müasir dövrün dinamik tələblərinə cavab verən həyatla əlaqəli proqramların hazırlanması labüddür, bu, təhsilin ümdə vəzifəsi kimi qəbul edilməlidir.

## İstifadə edilmiş ədəbiyyat


1. «Təhsil haqqında» Azərbaycan Respublikasının Qanunu. (2009) Bakı. Hüquq ədəbiyyatı.
2. Amabile T.M. (2006) *The Power of Ordinary Practices Harvard Business School Business Knowledge.* http://hbswk.hbs.edu/faculty/tamabile.html
3. Anderson A. (2012) *The European project semester: A useful teaching method in engineering education project approaches to learning in engineering education.* Journal of Engineering Education.Vol.45. Issue 2.
4. Choi D.G, Vries H.J. (2001) *Standardization as emerging content in technology education.* International Journal of Technology and Design Education.Vol 21. Issue 3.
5. Ellington H. (2001) SAGSET Conference Keynote Address: *«Using games, simulations and case studies to develop key skills».* SAGSET (Society for the Advancement of Games and Simulations in Education and Training).
6. Ellington H. (2004) *Using games, simulations, case studies and role play to stimulate students' creativity.* Imaginative Curriculum Guide. http://www.heacademy.ac.uk/1646.html.
7. Gardner H. (1993) *Creating Minds.* New York, Basic Books.
8. Gardner H. (2007) *Five Minds for the Future.* Boston, MA: Harvard Business School.
9. Hadavand S. (2008) *Ten effective Commandments in evaluation of training programs.* Monthly Management, New York.
10. Knapper Ch. (2008) *Changing teaching practice: strategies and barriers. Paper presented at Taking stock: Symposium on teaching and learning research in higher education.* Ontario, Canada.
11. Kneale P. (2004) *Enterprise in the higher education curriculum.* http://www.heacademy.ac.uk/1646.html.
12. Knight P. (2002) *The idea of a creative curriculum.* York, LTSN Generic Centre, New York.
13. Lin X., Luo H., Wu H. (2012) *Educational Model Innovating and Capability Improving Mechanism of Engineering Education Based on CDIO.* Creative Education.
14. Lynch D.J. (2008) *Confronting challenges: Motivational beliefs and learning strategies in difficult college courses.* College Student Journal. London.
15. Roberts P. (2006) *Nurturing creativity in young people: A report to Government to inform future policy.* Department for Culture, Media and Sport November.
16. Schmidmaier, R., Ebersbach, R., Schiller, M., Hege, I., Hlozer, M., & Fischer, M. R. (2011). *Using electronic flashcards to promote learning in medical students: Retesting versus restudying.* Medical Education, Vol. 45.
17. Schworm, S., & Renkl, A. (2006). *Computer-supported examplebased learning: When instructional explanations reduce selfexplanations.* Computers & Education, Vol. 46.
18. Scruggs, T. E., Mastropieri, M. A., & Sullivan, G. S. (1994). *Promoting relational thinking: Elaborative interrogation for students with mild disabilities.* Exceptional Children, 60, 450–457.
19. Son, L. K. (2004). *Spacing one's study: Evidence for a metacognitive control strategy.* Journal of Experimental Psychology: Learning, Memory, and Cognition, Vol. 30.
20. Spitzer, H. F. (1939). *Studies in retention.* Journal of Educational Psychology, Vol. 30.
21. Torrance E. (1964) Guiding creative talent - Englewood Cliffs/E. Torrance. - New Jersey: Prentice Hall.
22. Vega-Jurado J., Fernández-de-Lucio I., Huanca R. (2008) *University-industry relations in Bolivia: Implications foruniversity transformations in Latin America.* Higher Education, Vol. 56 (2).
23. Wyke R. (2013) *Teaching Creativity and Innovation In Higher Education.* Higher Education Management.
24. Zimmerman B.J. (2000) *Self-regulatory cycles of learning.İn G.A.Straka (ed.), Conseptions of self-directed learning, theoretical and conceptual considerations.* New York: Waxman.